# Mündəricat

# ƏMMAR YASİR

## Kitab haqqında


Kitabın adı:..............................Əmmar Yasir

Müəllif:.............................Cəvad Mühəddisi

Tərcümə edən:................Məhəmməd Turan

Nəşr edən:................................................Faiz

Çap tarixi:................................................٢٠٠٥

Çap növbəsi:.......................................Birinci

Tiraj:.........................................................٣٠٠٠

səh:١


## Ön söz

İnsanı böyük ruhların əzəməti qədər tə`sir altında saxlayan ikinci bir şey yoxdur. Hər bir gənc ideal, nümunə axtarışındadır. O bu idealı me`yar və rəhbər seçməklə “necə olmaq” və “necə yaşamaq” suallarına cavab arayır. Böyüklər də belədirlər. Amma .ideallar uşaqlıq və gənclik dövründə insana daha çox tə`sir edir

İslam tarixi hər biri bir dünya əzəmət paklıq və qəhrəmanlığa malik olan simalarla zəngindir. Həzrət Peyğəmbərin (s) imanlı və fədakar səhabələri, Əmirəl-mö`mininin ixlaslı dostları, digər imamların (ə) təqvalı şagirdləri və yaxınları hər biri öz növbəsində .bizi mə`nəviyyata ruhlandırır və şəxsiyyətimizi ilahiləşdirir

Bu simalar arasında Əmmar Yasir bariz mö`min şəxsiyyətlərdən, risalət və vilayət yolunda fədakar və vəfalı insanlardandır. İlkin İslam dövrü müsəlmanlarının qəhrəmanlıq tarixi və

.Əli (ə) aşiqlərinin fədakarlığı bu şəxsin şücaətləri ilə bəzənmişdir

Əlinizdəki kitabça Əmmarın həyatının müxtəlif mərhələlərinə bir baxışdır. Ümid edirik ki, ümmətimizin pak və fədakar gəncləri həqiqətin müdafiəsi səhnələrində və çirkinliklərlə mübarizə meydanlarında Əmmar Yasir kimi ideallara iqtida edəcəklər. .İndi isə haqq və vilayət yolunun bu şəhidinin nurani bioqrafiyasını nəzərdən keçirək

Qum, Cəvad Mühəddisi ۱۹۹۸-ci il, bahar

## Şəhadət ocağı

Bə`zən hadisələr insanların tərəqqisi üçün münasib şərait yaradır, İlahi təqdir insana .əbədi səadət nəsib edir. Əmmarın müsəlman olması da bu kimi hadisələrdəndir

Uzun illər Yəmənə hakim olmuş quraqlıq və fəqirlikdən sonra bu məntəqədə həyat canlanmağa başlayırdı. Yasir digər iki qardaşı ilə birlikdə, qəhətlik ucbatında onlardan ayrılmış başqa bir qardaşlarını axtara-axtara Məkkəyə gəldi. Onlar qardaşlarını tapa bilməyəcəklərinə əmin olduqdan sonra geri qayıtmaq qərarına gəldilər. Amma Yasir Məkkədə qalası oldu.(۱) Zaman ötdü. Yasir Məxzum qəbiləsinin rəisi Əbu Həzifə Məxzumi ilə həmpeyman oldu və onun pak kənizlərindən biri ilə evləndi. Bu kənizin adı (Süməyyə idi. Bu izdivacdan Əmmar dünyaya gəldi.(۲

səh:۵

---

İbn Səid, "Əl-təbəqat," c. ۴, səh. ۱۳۶ [۱]-۱

Mamacani, "Tənqihul-məqal", c. ۲, səh. ۳۲۰ [۲]-۲

Əmmar zülmün ayaq tutub yeridiyi cəmiyyətdə böyüyürdü. Məzlum kütlələr onları bu zülmətdən çəxaracaq ilahi xilaskarın zühurunu gözləyirdi. Nəhayət, Həzrət Məhəmməd (s) peyğəmbərliyə seçildi. Əmmar ata-anası ilə birlikdə müsəlman olmuş ilk şəxslərdən idi. Bu ailə Peyğəmbərlə (s) çiyin-çiyinə müqavimət, səbr və fədakarlıq .tarixi yaradırdılar

Hicazın isti və yandırıcı səhrası, günortanın qaynar günəşi Yasir və Süməyyənin qəhrəmanlığına şahid idi. Bu pir kişi və qoca qadının iman və əqidə yolunda çəkdiyi işgəncələr daşı əridirdi. Hər gün onları işgəncə içində görən girami İslam Peyğəmbəri (s) bu mətin insanları behiştlə müjdələyir, onları səbrə də`vət edirdi.(١) Bu səhnəni müşahidə edən Qüreyş müşrikləri işgəncələri daha da artırırdılar. Yasirlə Süməyyə isə gözlərini peyğəmbərin dodaqlarına



---

Ə`yanüş-şiə",c.٨. səh,٣٧٣" [٣] -١

.dikib, onun dilindən Allah kəlamını dinləmək şövqündə idilər

Yasir ailəsinin səbr və müqaviməti müşrikləri heyrətə gətirdi və nəhayət, bu iki əzəmətli insan Əbu-Cəhl və onun köməkçilərinin şallaqları altında şəhadətə çatdılar. Onlar İslamın ilk şəhidləri idilər. Yasir və Süməyyə Ərşe-Ə`laya qovuşdular və İslam .tarixinin səhifələrini qanları ilə rənglədilər

Bu iki qəhrəmanın gənc övladı Əmmar təqiyyə etməklə, əqidəsini gözləməklə canını qurtara bildi. O, ata-anasının cəlladlar əlində şəhadətə yetməsinə şahid oldu. Öz əzizlərini müdafiə etmək gücündə olmayan Əmmar dərin iztirab keçirirdi. Əmmar işgəncələr altında müşriklərin istədiyi sözü deməyə məcbur oldu. Amma onun qəlbi Allaha iman və eşqlə dolu idi. Onu küframiz sözlər deməyə məcbur etdilər. O, Peyğəmbərdən (s) xəcalət çəkirdi. Amma ayə nazil oldu və bu ayə Əmmarın

(imanına şahid duraraq, onun təqiyyəsini bəyəndi.(۱)

### Həbəşə və Mədinəyə hicrət

Əmmar Peyğəmbərin (s) göstərişi ilə Həbəşəyə mühacirət edənlər arasında idi. Bu dəstə canını Qüreyşilərdən qorumaqdan əlavə, hicrət etdikləri yerdə İslamı təbliğ .etməli idilər

İslam Peyğəmbərinin (s) Mədinəyə hicrətindən sonra Əmmar da mühacirlərlə birliklə Həzrətə (s) qoşuldu. O Mədinə məscidinin tikintisində Peyğəmbər (s) və müsəlmanlara kömək edirdi. Tikinti işində Əmmar iki nəfərin işini görür, ağır daşlar daşıyırdı. Peyğəmbər (s) ona buyurdu: "Əmmar! Özünü bu qədər zəhmətə salma." Əmmar dedi: "Bu məscidin tikintisində daha artıq işləmək istəyirəm." Həzrət (s) əlini Əmmarın (çiyninə qoyub buyurdu: "Sən behişt əhlisən, bir dəstə zalım səni qətlə yetirər."(۲)



---

Bax: "Nəhl", ۱۰۶ [۴] -۱

Ə`yanüş-şiə", c. ۸, s. ۳۷۳" [۵] -۲

## Əmmarın fəzilətləri

Əmmar böyük fəzilətlər sahibi idi. Mütəvatir, mö`təbər bir hədisi xatırlayaq: Siffeyn döyüşündə Əmr ibn As ətrafındakıları əmin edirdi ki, Əmmar əvvəl-axır bizə tərəf dönəsidir. Nəhayət, Əmmar şəhid oldu və onun şəhadəti Müaviyəyə böyük zərbə vurdu. Əmmar şəhid olana qədər səhabələrdən bə`ziləri bu döyüşdə iştirak etmirdilər. .Yalnız onun şəhadətindən sonra əksəriyyət bu döyüşə qatıldı

Həzrət Peyğəmbərin (s) Əmmar haqqındakı buyuruqları dildən-dilə gəzir. Həzrətin (s) sözləri Əmmarın simasını müsəlmanlara tanıtdırır və onu daha da sevdirir. Məhz .həzrət Peyğəmbərin (s) münasibətinə görə Əmmar bütün könüllərdə özünə yer tapır

Həmin vaxtlar Əmmarla Osman arasında mübahisə baş verir. Peyğəmbər (s) bu barədə eşidib buyurur: “Əmmardan nə istəyirlər? Əmmar onları behiştə də`vət edir, onlar isə Əmmarı cəhənnəmə sürükləyirlər. Əmmar mənim üçün iki

gözümün arası kimidir."(۱) Digər bir buyuruğunda Həzrət (s) Əmmarın uca məqamını belə işıqlandırır: "Əmmar başdan-ayağa imanla doludur. İman onun ətinə-qanına hopub."(۲) Nəql olunan hədislər Əmmarın şəxsiyyətinin ucalığını göstərir. Süffeyn döyüşündə Əmmar hara üz tuturdusa, səhabələr də onun ardınca gedirdi. İslam Peyğəmbəri başqa bir hədisdə belə buyurur: "Behişt Əmmarın müştaqıdır."(۳) Həzrət Peyğəmbər (s) Əmmarı qətlə yetirən şəxsə cəhənnəm və`d edir. Bütün bu deyilənlər Əmmarın fəzilətlərinin təsdiqidir. Bu fəzilətlərdən xəbərdar olan Peyğəmbər (s) Əmmar haqqında dəyərli sözlər bəyan etmişdir. Əmmar rəvayətlərdə Peyğəmbər (s) səhabələrinin dörd sütunundan biri sayılır. O həmin dörd nəfərdəndir ki, behişt onların (sorağındadır.(۴



---

Ə`yanüş-şiə", c. ۸, s. ۳۷۳" [۶] -۱

Həmin mənbə [۷] -۲

Həmin mənbə [۸] -۳

Əl-ixtisas", s. ۷" [۹] -۴

Əmmarın qəzəbi Allahın qəzəbidir.” Bunu həzrət Peyğəmbər (s) buyurmuşdur. Tarixi “ bir söhbət Əmmar Yasirin məqamını bir qədər də açıqlayar: Xalid ibn Vəlid və Əmmar arasında mübahisə yaranmışdı. Xalid həzrət Peyğəmbərin (s) hüzuruna gedib Əmmarın yanındaca onun haqqında xeyli mənfi sözlər söylədi və şikayət etdi. Əmmar Xalidin bu hərəkətindən narahat olub ağladı və dedi: “Ya Rəsuləllah! Görürsənmi nə edir?” həzrət Peyğəmbər (s) başını qaldırıb buyurdu: “Hər kəs Əmmarı qəzəbləndirsə, Allah onu öz qəzəbinə düçar edər. Hər kəs Əmmarı axmaq və düşüncəsiz saysa, Allah (onu axmaq və düşüncəsiz sayar.”(١)

Səxavət, isar Əmmarın digər fəzilətlərindəndir. Cabir ibn Əbdüllah Ənsari belə nəql edir: Bir gün əsr namazından sonra Peyğəmbər məsciddə oturmuşdu və onun ətrafında səhabələr toplanmışdı. Məscidin bir küncündə



---

Əsədul-ğabə”, c. ۴, s. ۴۵“ [١٠]-١

palpaltarı cırıq-yırtıq, arıq bir kişi oturmuşdu. Həzrət Peyğəmbər (s) ona müraciətlə buyurdu: "Əgər bir istəyin varsa, de yerinə yetirək." Qoca kişi dedi: "Ya Rəsulilah! Bir müddətdir acam... Ailəmin yanına qayıtmaq üçün də yol pulum yoxdur." Həzrət buyurdu: "Mənim yanımda sənə verməyə bir şey yoxdur, amma səni bir evə ".göndərəcəyəm, nə istəsən verəcəklər

Sonra həzrət Peyğəmbər (s) onu Bilala qoşub həzrət Zəhranın (s) evinə göndərdi. Onlar evin qapısına çatdıqları vaxt qoca kişi dedi: "Salam olsun sizə, ey peyğəmbər əhli beyti! Sizin eviniz vəhyin nazil olduğu və mələklərin gəldiyi yerdir." Qocanın səsini eşidən Zəhra buyurdu: "Salam olsun sənə! Haradan gəlmisən və nə istəyirsən?" Qoca dedi:" Ehtiyaclarımın ödənməsi üçün atanız məni buraya göndərdi." Həzrət Zəhra özü də bir müddət idi ki, ac idi. Evə baxdı və Həsənlə (ə) Hüseynin (ə) altındakı qoyun dərisini gördü. Uşaqlar onun üstündə yatmışdılar. Həzrət

Zəhra (s) dərini qocaya vermək istədi. Amma qoca dedi: “Mən acam, qoyun dərisinə ehtiyacım yoxdur!” Nəhayət, həzrət Zəhra öz boyunbağısını çıxarıb kişiyə verdi. Qoca boyunbağını götürüb, həzrət Peyğəmbərin yanına gəldi və əhvalatı ona danışdı. Həmin vaxt Səlman, Əbuzər və Miqdad da orada idi. Əmmar həzrət Peyğəmbərdən icazə istədi ki, dəyərini ödəyib, qocadan boyunbağını alsın. Həzrət (s) buyurdu: “Ey Əmmar, boyunbağını al. Hər kəs bu boyunbağının alınmasına şərik olsa, Allah onu oda və əzaba düçar etməz.” Əmmar boyunbağının müqabilində ٢٠ dinar ٢٠٠ dirhəm pul, geyim və çörək verdi, Xeybər döyüşündə payına düşmüş qənimətdən kişi üçün yol azuqəsi tədarük etdi. Əmmarın səxavəti kişini heyrətə gətirmişdi. Bütün hazırlıqlardan sonra qoca Peyğəmbərin yanına gəlib, ona təşəkkürünü bildirdi. Peyğəmbər (s) başını qaldırıb, həzrət Zəhraya (s) dua etdi. Sonra o, Səlmana, Əmmara və Miqdada Həzrət Əli (ə) və xanım

Zəhranın (s), imam Həsənlə (ə) imam Hüseynin (ə) bə`zi fəzilətləri haqqında söhbətlər .etdi

Əmmar evə qayıdıb, boyunbağını qiymətli bir parçaya bükdü və ətirlədi. Onu Xeybər döyüşündə payına düşmüş kənizlə birlikdə Peyğəmbərə (s) hədiyyə göndərdi. Həzrət Peyğəmbər (s) hədiy-yələri qəbul edib, qızı Fatimənin (s) ixtiyarına verdi. Kəniz əhvalatı həzrət Fatiməyə danışdıqdan sonra xanım Fatimə onu Allah yolunda azad etdi. Kənizin gülümsədiyini görən Fatimə (s) bu gülüşün səbəbini soruşdu. Kəniz belə cavab verdi: “Bu boyunbağına gülürəm. Bir boyunbağı acı doyurdu, yoxsulu geyindirdi, möhatcın ehtiyacını aradan qaldırdı, bir qulu azad etdi, nəhayətdə isə öz sahibinə (qayıtdı.”(١)

Təfsirçilərin bildirdiyinə görə, Qur`anın bə`zi ayələri Əmmarın şə`nində nazil olmuşdur. Allahın saleh bəndələrindən danışan, gecə səh:١۴

---

Biharül-ənvar”, c. ۴٣, s. ۵۶“ [١١]-١

ibadətlərinə məşğul olan insanları xatırladan, Allahın mərhəmətinə ümidvar mö`minləri yada salan bə`zi ayələr onun şə`nində nazil olmuşdur.(۱) Eləcə də, bilənləri bilməyənlərdən üstün tutan, sübh və şam Allaha pərəstiş edənlərdən danışan, yalnız Allahın razılığını düşüənlərdən söhbət açan ayələr də bu qəbildəndir.(۲) Xalq arasında nur kimi xatırlanan çöhrədən danışan ayə də Əmmarın şə`nindədir.(۳) Bu .ayələrin Əmmarın şə`nində nazil olması "Əl-ğədir" kitabında qeyd olunmuşdur

### Şəhadət xəbəri

Əmmarın döyüşlərdə və Peyğəmbərlə (s) yanaşı fəaliyyətlərdə rolu cəlbedicidir. Əhzab (Xəndək) döyüşündə Səlmanın təklifi ilə xəndək qazılarkən Əmmar var qüvvəsi ilə çalışır. Yorğun, taqətsiz, üzü-gözü toz-torpağa bulaşmış



---

Zumər", ۹" [۱۲]-۱
Ənam", ۲" [۱۳]-۲
Ənam", ۱۲۲" [۱۴]-۳

Əmmarı görən Peyğəmbər (s) buyurur: “Xəbərdar ol, ey Süməyyə oğlu, zalım qövm (səni öldürəsidir.”(۱)

Bu cümləni həzrət Peyğəmbər (s) dəfələrlə, eləcə də, Mədinə məscidi tikilərkən buyurmuşdur. Bəli, Əmmarın Süffeyn döyüşündə Müaviyə ilə vuruşda şəhadətə .yetəcəyi xəbərini həzrət Peyğəmbər (s) öncədən bildirmişdir

### Haqq və vilayətin müdafiəsi

Həzrət Peyğəmbərin (s) vəfatından sonra Əmmar bəziləri kimi rahatlıq və sərvət dalınca qaçmadı. Əksinə, o, haqqın müdafiəsi yolunda olmazın məhrumiyyətlərinə düçar oldu. Peyğəmbərin (s) vəsiyyətlərinin görməməzliyə vurulması Əmmarın iman .dolu vücudunu haqq və fəzilət müdafiəçisi kimi ağrıdırdı

Əmmar “şurtətul-xuməys” adlanan qrupdan idi. Bu qrupda olan insanlar din və



---

Ə`yanüş-şiə” c. s. ۳۷۵“ [۱۵]-۱

Əlinin (ə) rəhbərliyinin himayəsi yolunda fədakarlıq üçün candan keçənlər idilər. (Həzrət Peyğəmbər (s) və Əli (ə) də onları behiştlə müjdələmişdi.(١)

Əmmar Peyğəmbər səhabələri, Səlman Farsi, Əbuzər Qəffari, Miqdad ibn Əsvəd, Əbu Əyyub Ənsari, Xəzimə ibn Sabit, Osman ibn Hənif, Səhl ibn Hənif ilə birlikdə məscidə gəlib, imam Əlinin haqqının müdafiəsi üçün müsəlmanların qarşısında çıxış etdi.(٢) Bu toplantıda Əmmar belə dedi: "Ey Qüreyş! Ey müsəlmanlar! Əgər bilmirsinizsə, bilin ki, sizin Peyğəmbərinizin Əhli-beyti onun ən layiqli varisləri, dini işlərdə möhkəm və ən əmin mö`minlərdir. Onlar millətin nəzarətçisi və ümmətin xeyirxahlarıdır. Onun Əhli-beyti ilə dostluğunuz qırılmamış, dininiz zəifləməmiş, fitnələr üstünüzə hücum çəkməmiş haqqı öz sahibinə qaytarın. Aranızda ixtilaf düşməmiş, tamahkar



---

١- [١۶] "Əl-ixtisas", ٣

٢- [١٧] "Tənqihul-məqal", c. ٢ s. ٣٢١

düşmən dininizi zaya çıxarmamış hərəkət edin. Yaxşı bilirsiniz ki, Bəni-Haşim sizlərdən ləyaqətlidir, Əli, Allah və Onun rəsulunun sizinlə bağladığı müqaviləyə əsasən, sizin imamınızdır. Siz aşkar üstünlüklərini bilirsiniz. Peyğəmbər sizin evlərinizin məscidə açılan xüsusi qapılarını bağladı, Əlinin qapısı açıq qaldı. Həzrət, qızı Fatiməni Əliyə verdi və onun haqqında buyurdu: "Mən elmin şəhəriyəm, Əli isə onun qapısıdır. Elm istəyənlər bu qapıdan daxil olmalıdırlar." Siz dini işlərinizdə ona müraciət etməyə məcbursunuz. O isə sizdən ehtiyacsızdır. Onun layiqli keçmişini bilirsiniz. Belə bir keçmişə isə heç biriniz malik deyilsiniz. Bəs necə olub ki, ondan əlinizi üzüb haqqını əlindən almısınız?! Bilin ki, zalımların cəzası pisdir. Cahiliyyət dövrünə qayıtmayın, ziyan görərsiniz.(١)



---

١- [١٨] "Biharul-ənvar", c. ٢٨, s. ١٩٨

Əmmar deyir: “Mən Peyğəmbərlə (s) yaşıd idim.” Əmmar ilkin müsəlmanlardan idi. O, ömrünün bir hissəsini Məkkədə düşmənlərlə mübarizidə və işgəncələr içərisində keçirmişdir. Mədinədə Peyğəmbərin (s) həyatı dövründə müharibələrdə iştirak etmiş və həzrətin (s) şəhadətindən sonra haqq cəbhənin müdafiəsində dayanmış, iki xəlifənin dövründə müharibələrdə olmuş, bütün ömrünü cihada həsr etmişdir. .Nəhayət, Siffeyn döyüşündə Əmmar ۹۴ yaşında şəhid olmuşdur

**Cəbhələrdə**

Əmmar Yasir həzrət Peyğəmbərin (s) həyatı dövründə canını ovucunda tutub, İslamın müdafiəsində dayanmış mö`minlərdən idi. O, müşriklər və təcavüzkarlarla fədakarcasına mübarizə aparırdı. Peyğəmbərdən (s) sonra xilafət məsələsində .yanlışlıqlara yol verilsə də, Əmmar İslamın müdafiə səngərini boş qoymamışdı

Yəmamə döyüşündə mürtədlərlə qəhrəmancasına vuruşan Yasir bu döyüşdə yaralandı. Müsəlmanların ruhiyəsində zəiflik görən Əmmar bir qaya parçasının üstünə ”?çıxıb, onları müqavimətə çağırır və deyirdi: “Yoxsa behiştdən qaçırsınız

Zəifləmiş müsəlman qüvvələri Əmmarın şücaətindən və alovlu sözlərindən cür`ətlənib yenidən onun ətrafında toplandılar. Al qanına qəltan olmuş yaralı döyüşçülər yenidən səfərbər olub, düşmənin hücumunu dəf edə bildilər. Nəhayət, bu döyüşdə .müsəlmanlar qalib gəldilər

Əmmarın misilsiz qəhrəmanlıqlarından bir hissəsi Əmirəl-mö`minin (ə) xilafəti dövrünə düşür. O, həzrətlə (ə) çiyin-çiyinə təcavüzkarlar və əhdini sındıranlarla döyüşür və sonra şəhadət şərbətini başına çəkir. Əmmarın Cəməl və Süffeyn .döyüşün-dəki rəşadətləri haqqında yenə də danışacağıq

## Əmmarın Kufədə valiliyi

İslamın böyük şəhərlərindən biri olan Kufədə müəyyən müddət Əmmar Yasir valilik etmişdir. İkinci xəlifənin dövründə Əmmar Kufəyə vali tə`yin olunur. İbn Məs`ud da bir Qur`an müəllimi və xəzinədar kimi onu müşayiət edir. Xəlifənini onlara aid olan hökmündə belə yazılmışdı: "Bu iki şəxs Məhəmmədin (s) ən üstün və seçilmiş (köməkçilərindəndirlər. Onları dinləyin və onlara iqtida edin."(١)

Peyğəmbərdən tərbiyə almış Əmmar yalnız Allahın razılığı və vəzifəsini yerinə yetirmək barədə düşünürdü. Kufə kimi böyük və həssas bir şəhərin valisi olmasına baxmayaraq, Əmmar üçün ixlas, təvazö və təqva hər şeydən uca idi. O, Əmirəl-mö`minin (ə) eşqi ilə dolu bir qəlblə yalnız qısa müddət Kufədə hakim oldu və onun .hakimiyyəti altında olan xalqın əksəriyyəti Əlinin (ə) tərəfdarları idi



---

Əl-təbəqat", c. ۶, s. ٨" [١٩] -١

Onun ədalətli və dinə müvafiq rəftarı bə`zi dünyatələbləri razı salmadı. Onlar xəlifəyə ünvanlanmış böhtan dolu mə`lumatları ilə Əmmarın işdən uzaqlaşmasına nail oldular. Əmmar yenidən Mədinəyə qayıtdı və həzrət Əlinin (ə) elm və helm dəryasından .faydalanmaqda davam etdi

Əmmar Mədinəyə qayıtdığı vaxt ondan soruşdular ki, işdən uzaqlaşdırılmağın səni narahat etmirmi? Əmmar belə cavab verdi: “Mənə bu iş həvalə olunanda ”!sevinməmişdim ki, kənarlaşdırılanda da narahat olam

**Nəhy əz münkər” – pisliyin qadağa səngərində“**

Peyğəmbərdən (s) sonra İslam hakimiyyətini öhdəsinə götürmüş bə`zi şəxslərin beytül-maldan, İslam büdcəsindən sui-istifadə etməsinə tarix şahiddir. Hakimiyyət kürsüsündə oturanların çoxları yetərincə təqvalı olmadığından şeytana aldanaraq, -beytül

.malı şəxsi malı kimi öz yaxınlarının ehtiyacına sərf edərdilər

Üçüncü xəlifə Osmanın dövründə İslam dövləti əsasən Əməvilər tərəfindən idarə olunduğu vaxt bu məsələ özünü daha da qabarıq nəzərə çarpdırdı. Həmin dövrdə imanlı və qeyrətli müsəlmanlar hakimiyyətin iqtisadi fəsadlarına qarşı mübarizə aparır, e`tirazlarını bildirirdilər. Dövlətin iqtisadi siyasətini tənqid edənlərdən biri də Əmmar .Yasir idi

Üməyyə ailəsinin hərəkətlərini sərt tənqid edən Əmmar xilafət başçılarının qəzəbinə tuş gəldi. Onu e`tirazlarına görə incitdilər, işkəncə verdilər, zindana saldılar, təhqir etdilər. Əmmar öz rəftarını dini bir vəzifə bildiyindən sorağına gəlmiş əziyyətləri də həvəslə qarşılayırdı. O tutduğu yolun ağır əzab-əziyyətləri müqabilində deyirdi: “Nə olur olsun, Allaha həmd oxuyuram. Allah yolunda

(birinci dəfə deyil ki, işkəncə görürəm.”(١)

Əmmar xilafət və qanunsuz şura məsələsinə qarışdıqda onunla sərt rəftar edib dedilər: “Sənin bu işə qarışmağa haqqın yoxdur.” Əmmar isə belə cavab verdi: (“Əlhəmdulilah! Haqq tərəfdarları daim məzlum olmuşlar!”(٢)

Əmmarın şücaətinin sübutu üçün təkcə bunu demək kifayətdir ki, müsəlmanların hökumət mə`murlarından yazdığı şikayət məktubunu Əmmar tək-tənha aparıb xəlifəyə çatdırdı. Bu görüşdə iştirak edən Mərvanın təhriki ilə elə oradaca Əmmarı kötəkləyib, haldan saldılar və huşsuz halda bayıra atdılar. Müsəlmanlar Əmmarı ayağa (qaldırıb apardılar.(٣)

Əmmarın iti dili, şücaətli qəlbi və nüfuzlu imanı vardı. O öz dini vəzifəsini yerinə yetirərkən heç bir sazişə getməz və süstlük göstərməzdi. səh:٢۴

---

Əl-ğədir”, c. ٩, s. ١۶“ [٢٠] -١

Ə`yanüş-şiə”, c. ٨, s. ٣٧۴“ [٢١] -٢

Əl-ğədir”, c. ٩, s. ١۶“ [٢٢] -٣

Əmmar e`tiraz edənlərin natiqi, fəryad çəkənlərin səsi, Həzrət Əlinin (ə) yoluna .inananların öncülü idi

Bütün bu səbəblərdən Əmmar üçün cinayətkar məs`ulların əməllərinə dözmək çətin gəlirdi. Onu da dəfələrlə böyük səhabə Əbuzər Qəffari kimi sürgün etmək istəmişdilər. Amma xalqın rə`yi və həmpeyman olduğu qəbilənin himayəsi bu işə mane olurdu. Cinayətkar hakimiyyət Əmmarın tənqidlərindən yaxa qurtarmaq üçün yol tapa .bilmirdi

**Əmmar Yasir, haqla batilin me`yarı**

Əlbəttə ki, insanlar haqq tərəzisinə qoyulmalı, onların şəxsiyyəti həqiqətə əsasən dəyərləndirilməlidir. Amma bə`zən insan özü elə bir iman, ixlas, təqva həddinə çatır ki, haqq ölçüsü, haqq nümunəsi, haqq nişanəsi olur. Bə`zən həqiqəti tanımaq üçün insanı ölçü götürmək lazım gəlir. Bə`zi insanların

.əməlinə, danışığına və mövqeyinə əsasən həqiqəti tanımaq olur

Əmmar da haqla batilin ölçüsü olmuş çöhrələrdən sayılır. Bu üsul həzrət Məhəmmədin (s) tərəfdarları arasında məşhur bir üsul idi. Onların qarşısına bir çətinlik çıxdıqda deyərdilər: "Baxın görün Əmmar Yasir necə hərəkət edir, hansı yolu seçir?" Nümunə :üçün aşağıdakı hallara nəzər salaq

Bir kişi Əbdüllah ibn Məs`uddan soruşdular: "Əgər qarşıya bir fitnə çıxsa, haqqı .١ "?tanımaq üçün nə edim

İbn Məs`ud deyir: "Qur`ana müraciət et." Kişi yenə soruşur: "Əgər hər iki müxalif dəstə Qur`ana müraciət edib dəlillər göstərsələr necə?" İbn Məs`ud deyir: "Bax gör Əmmar Yasir hansı dəstədədir, sən də həmin dəstəyə qoşul, çünki Əmmar daim (haqlıdır."(١

Hüzeyfə Yəmani bu bəsirətli və münafiq tanıyan insan dostlarına tövsiyyə edir ki, .٢ heç vaxt Əmmarın əksinə



---

Əl-irtiyab", c. ٢, s. ۴٨٠" [٢٣] -١

hərəkət etməsinlər. Çünki Əmmar ölümünədək haqdan ayrılmaz və haqq hardadırsa, (Əmmar da onunladır.”(١

Siffeyn döyüşündə də Əmmar haqla batil ölçüsü oldu. O haraya üz tuturdusa .٣ .Peyğəmbər (s) səhabələri onun ardınca gedirdilər

Bə`zi səhabələr Peyğəmbərin Əmmarın şəhadəti barədəki buyuruğunu əsas .۴ götürərək, o şəhid olanadək vuruşdan çəkindilər. Onlar yalnız Əmmarın şəhadəti ilə .haqq cəbhəsini tanıya bildilər

Əmmar Yasirin həqiqət ölçüsü olması həzrət Peyğəmbərin (s) buyuruğuna əsaslanır. Həzrət (s) buyurmuşdur: “Əmmar haqla, haqq isə Əmmarla olur. Haqq hansı tərəfə (dönsə, Əmmar da həmin tərəfə dönər.”(٢



---

Həmin mənbə [٢۴]-١

Tənqihul-məqal”, c. ٢, s. ٣٢١“ [٢۵]-٢

## İşarə

Osmanın qətli və Əmirəl-mö`mininin xilafətə çatması ilə İslam tarixində yeni və parlaq bir dövr başladı. Həzrət Əli (ə) iyirmi beş il müsəlmanların vəhdətini qorumaq xatirinə xanənişin olub, hakimiyyətdən kənarda qaldı. Sonradan xalqın tə`kidləri ilə yenidən siyasət səhnəsinə qayıtdı və müsəlmanlar ona bey`ət etdilər. Sədaqətli səhabələrin, Peyğəmbərin (s) pak tərəfdarlarının meydana dönməsi üçün şərait yarandı. Onlar .yenidən var gücləri ilə cihad və təbliğə məşğul ola bilərdilər

Əllamə Təbatəbainin "İslamda şiə" kitabındakı təhlillərə əsasən, Əmmar və onun həmkarları Həzrət Əlinin (ə) iş başına gəlməsini İslamın dirçəlişi, küfrün məğlubiyyəti kimi qəbul edən insanlar idilər. Bu insanlar ciddi sə`y ilə ayağa qalxıb, İslamı dirçəltmək və böyük şiə inqilabını hifz etmək üçün çalışırdılar. Şiələrin

.Həzrət Əliyə (ə) bey`ət günündəki sözləri deyilənlərə sübutdur

Artıq Əmmar Yasir pirani bir kişidir. O öz ömrünün ötən illərində acılışirinli hadisələrə şahid olmuşdu. Əmmar mübarizə, vəfadarlıq, müqavimət və haqq yolda möhkəmlik .nümunəsidir

Əmmar Ələvi hakimiyyəti dövründə Qur`ana meydan açılmasından xoşhaldır. Qohumbazlıq, beytülmalın qarəti və bu kimi İslama yaraşmayan işlərin aradan qalxması onu sevindirir. Əgər Əli ibn Əbu-Talib kimi bir şəxs hakim olmuşsa, yaşının ötməsinə baxmayaraq, ۹۰ yaşlı bu insan da İslama və müsəlmanlara xidmət edə .biləcək

Əlinin hökuməti haqq və ədalət hökumətidir. Təbii ki, zalımlar, dünyagirlər ona qarşı çıxasıdırlar. Həzrət Əlinin (ə) iş başına gəlməsi ilə Əmmar Mədinə asayişinə məs`ul olur. Məxfi mə`murlar münafiqlərin, dünyapərəstlərin, Bəni-Üməyyə hizbinin təxribatları haqqında mə`lumatlar

gətirirlər. Əmmar bu mə`lumatlarla tanış olub, zəruri bildiyi məsələlər haqqında Həzrət Əliyə (ə) mə`lumat verir. Şamda müxalif qüvvələrin asta-asta baş qaldırdığı mə`lum olur. Bəsrədən olan bir qrup xəyanətkar Osmanın qətlini bəhanə edərək, Həzrət Əli (ə) ilə bey`ətlərini pozub, qiyam hazırlayırlar. Bu xəyanətkarların başında Təlhə və Zübeyr dayanır. Onlar Ayişəni qabağa salaraq, peyğəmbərin arvadının nüfuzundan öz mənfur niyyətlərini həyata keçirmək üçün istifadə edirlər. Nəhayət, .Cəməl döyüşünə yol açılır

Həzrət Əli (ə) düşmənlə mübarizə üçün Kufəni mərkəz seçmək istəyir. Kufə əhalisini hazırlamaq üçün bir qrup adam göndərir. Haşimi Mirqal məktub yazaraq Əbu-Musanın müxalifəti barədə həzrətə mə`lumat verir. Həzrət (ə) imam Həsənlə (ə) Əmmarı oraya göndərir. İmam Həsən (ə) çıxış edir, Əmmar da öz sözlərini deyir. Bununla belə Əbu-,Musa öz müxalifçiliyini davam etdirir. O

xalqı Cəməl döyüşünə səfərbərlikdən çəkindirir. O gah Peyğəmbərdən hədis gətirir, gah Ayişənin naməsini oxuyur. Nəhayət, Həzrət Əli (ə) Malik Əşdəri çağırıb buyurur: "Əbu-Musanın işdən uzaqlaşdırılmasına sən imkan vermədin. İndi bax gör nə edir!" Malik əzr etdi: "Mən özüm onu islah edərəm." Malik Əştər yola düşüb Kufəyə getdi. O, .Əbu-Musanı Kufədən çıxarıb, əzəmətli bir qoşunu düşmənlə döyüşə səfərbər etdi

İşdən kənarlaşdırılmasından narahat olan Əbu Musa Peyğəmbərin (s) adından yalanlar uydurараq, belə bir təbliğat apardı ki, guya fitnə yaranıb və kənarda dayanmaq lazımdır. Əbu Musa özü həzrət Əliyə (ə) arxa çevirməklə yanaşı, xalqı müharibədən çəkindirmək, cihaddan yayındırmaq, imamın (ə) tərəfdarları arasında .süstlük yaratmaq istəyirdi

Həhajət, имам Һəсəн (ə) вə Əммар Јасир једди мин нəфəр һүдудунда дөјүшчү јығмаға мүвəффəг олдулар. Онларын

сәфәрбәрлик саһәсиндәки мүвәффәгиј-јәти Әлини (ә) хошһал етди вә һәзрәт .чидди дөјүш гәрарына кәлди

## Cəməl döyüşündə Əmmarın rolu

Həzrət Əlinin (ə) Mədinə və Kufədən yığılmış əzəmətli qoşunu Bəsrəyə yaxınlaşırdı. Həzrət Əlinin (ə) Bəsrəyə varid olmasını gözəl şəkildə təsvir edən Məs`udi bunu həzrət Peyğəmbərin (s) Məkənin fəthi zamanı bu şəhərə varid olmasına bənzətmişdir. Mücahidlər min nəfərlik dəstələrlə, tam silahlanmış halda Əbu-Əyyub Ənsari və Xəzimə ibn Sabit kimi səhabələrin komandanlığı altında idilər. Bu dəstələrdən birinə Əmmar Yasir komandanlıq edirdi. Nəql edirlər ki, Əmmar qara əmmamə qoyub, onun bir ucunu öndən sallamış və ağ paltarla yüyrək bir ata süvar olmuşdu. O aram və vüqarla hərəkət edir, belində qılınc, çiynində kaman, Qur`an qiraət edirdi. Əmmarın əlindəki ağ bayrağın altında alnında

.səcdə yeri olan min süvari cəmlənmişdi

Bu dəstələrdən biri də Həzrət Əlinin (ə) ətrafında idi. Onun bir tərəfində Həsən (ə), digər tərəfində Hüseyn (ə) qarşısında çiynində bayraq tutmuş digər oğlu Məhəmməd Hənəfiyyə hərəkətdə idi. Arxasınca Cəfər ibn Əbu-Talibin oğlu Əbdüllah gəlirdi. Əqilin övladları və Bəni-Haşim cavanları həzrəti üzük qaşı kimi əhatəyə almışdılar. Onların .aralarında Bədr döyüşünün bə`zi döyüşçüləri, mühacirlər və ənsarlar da görünürdü

Əlinin (ə) qoşunu Bəsrə kənarına çatıb, orada düşərgə saldı. Həzrət Əli (ə) qardaş qanının axıdılmasının qarşısını almaq üçün, höccətin tamamlanması məqsədi ilə qadis göndərib, qarşı tərəfə bey`əti xatırlatdı. Amma bütün bunların heç bir əsəri olmadı. .Cəməl fitnəkarları həzrətlə (ə) döyüşdə israrlı idilər

Həzrət Əlinin (ə) əmri ilə onun ətrafındakılardan Müslim adlı biri

əlinə Qur`an götürüb, imamın buyuruqlarını düşmənə çatdırmaq üçün yola düşdü. .Düşmən Müslimə hücum edib, onun iki qolunu vurdu, nəhayət, Müslim şəhadətə yetdi

**!Artıq növbə qılınca çatdı**

Artıq deyiləsi sözlər deyilmiş, höccət tamamlanmışdı. Düşmən ağıl və düşüncəni bir .kənara qoyub, fitnə alovunu qızışdırırdı. Yeganə çarə düşmənlə vuruş idi

Həzrətin (ə) göstərişi ilə cərgələr düzülməyə başladı. Əmmar Yasir sonuncu dəfə qabağa çıxaraq, düşmənə moizə etdi, onlara xitabən dedi: “Ey insanlar! Siz Peyğəmbərə (s) münasibətdə insaflı hərəkət etmədiniz. Öz arvadlarınızı evinizdə saxlayıb, Peyğəmbərin arvadını bayıra çıxardınız, döyüş meydanında qılıncların, ”...!nizələrin, oxların altında saxladınız

Əmmar bir az da qabağa getdi və Ayişənin kəcavəsi ilə üzbəüz dayandı. O öz sözləri ilə Ayişəni bu fitnə-fəsaddan çəkindirməyə çalışdı. Bu vaxt

düşmən oxları yağış tək Əmmarın üstünə yağmağa başladı. Əmmar oxlardan yayınıb, Həzrət Əmirin (ə) yanına qayıtdı və dedi: “Ey Əmirəl-mö`minin! İndi nəyi gözləyirsən? Savaş ocağı qızışmışdır, əllər qılıncların qəbzəsinə getmişdir, oxlar kamana ”.qoyulmuşdur

Əmirəl-mö`minin (ə) hücuma başlamazdan əvvəl öz döyüşçülərinə tövsiyələr verərək, onları İslamda döyüş qaydaları, insanlıq hədləri, zəiflərə və yaralılara diqqət, müdafiəsiz insanların himayəsi məsələləri ilə tanış etdi. Həzrət (ə) bir nəfər də göndərib, Ayişənin qoşununa e`lan etdi ki, ey Qureyş cavanları, olsun ki, siz üzə düşüb (dayanmısınız, gəlin Malik Əştər və Əbdüllah ibn Cündəblə üz-üzə gəlməyin.(١

Döyüş başladı. Haqq və Allah aşiqləri Əli (ə) ilə çiyin-çiyinə qəhrəmanlıq dastanı yaratdılar. Mücahidlərin



---

Şeyx Müfid, “Əl-Cəməl”, s. ٣۴٢ [٢۶] -١

qılıncları fitnəkar qövmün başının üzərindən ley kimi şığıyırdı. Düşmən qoşununun böyük hissəsi Ayişənin kəcavəsi ətrafında toplanmışdı. Həzrətin (ə) əmri ilə Əmmar Yasir, Malik Əştər və Müəmmər ibn Əbdüllah adlı digər bir cavan düşmən qoşununun arasında Ayişənin dəvəsini axtarmağa başladılar. Həmlə zamanı Ayişənin dəvəsi bir nərə çəkib yerə yıxıldı və onun ətrafındakılar qaçmağa üz tutdular. Ayişənin qardaşı Məhəmməd ibn Əbu-Bəkr bacısını götürüb döyüş səhnəsindən uzaqlaşdırdı. Düşmən üzərində qəti qələbə çalındı. Həzrət Əlinin göstərişi ilə Peyğəmbərin arvadı bir qədər .istirahətdən sonra hörmətlə Mədinəyə yola salındı

Cəməl döyüşündə Əmmar böyük şücaətlər göstərdi və savaşın Həzrət Əlinin (ə) .xeyirinə nəticələnməsində mühüm rol oynadı

## Siffeyn döyüşündə

### İşarə

Cəməl döyüşü haqq cəbhəsinin xeyirinə tamamlandı. Amma qarşıda daha çətin bir döyüş vardı. Hakimiyyət istəyində olan qiyamçı Müaviyə Həzrət Əlinin (ə) qanuni və ilahi hakimiyyətinə qarşı çıxaraq, Şam məntəqəsini özünə tabe etdi. Həzrət Əli (ə) Şam .fitnəsinin də qarşısını almaq fikrində idi

Dünya həyatı ardınca qaçan bir qrup vəfasız yaxasını kənara çəkdi, bə`ziləri də şübhədən çıxa bilmədi. Hansı ki, Həzrət Əlinin (ə) və Əmmar Yasir kimi bə`zi səhabələrin mövqeləri Müaviyə ilə mübarizənin zəruriliyini açıq-aşkar göstərirdi. Xüsusi ilə, Əmmarın haqq me`yarı olan sözləri tərəddüdlərdən qurtarmaq üçün çox tə`sirli idi. Əmmar qılıncı ilə haqq müxaliflərini cəhənnəmə göndərən və haqtələblərin qəlbinə qüvvə verən bir qəhrəman idi. Əmmar haqq mizanı olduğundan onunla çiyin-çiyinə döyüşənlər əmin idilər ki, öldürüləcəkləri təqdirdə şəhid olacaqlar və behiştə gedəcəklər. Onunla

vuruşanların da cəhənnəmə qovuşacağına heç bir şübhə yox idi. Çünki Əmmar haqla, .haqq isə Əmmarla idi. Haqq yalnız Əmmarın dayandığı cəbhədə ola bilərdi

Deyildiyi kimi, bu mizan və me`yar müsəlmanlar arasında yaxşı tanınırdı. Haqq və batil .cəbhələrini tanımaq üçün Əmmarın mövqeyinə istinad etmək yetərdi

Nəql olunur ki, həmin Siffeyn döyüşündə Şam əhlindən olan Zulkəla Həmiri adlı bir şəxs Əli (ə) döyüşçülərinə xitabən Əbu-Nuhu tələb etdi. Onlar bir kənara çəkilib xeyli söhbət etdilər. Zilkəla həzrət Peyğəmbərin (s) İraq və Şam qoşunları arasındakı döyüşündən danışan hədisini xatırladı. Həzrət (s) bildirmişdi ki, Əmmar hansı cəbhədə olsa, həmin cəbhə də haqlıdır. Əbu-Nuh Allaha and içdi ki, Əmmar bizim aramızdadır və bu döyüş hamıdan çox o israrlıdır. Əbu-Nuh dedi: “ Mənim arzum sizinlə döyüşmək və sizi səh:٣٨

öldürməkdir. Hətta sən mənim əmim oğlu olmuş olsan da! Çünki İslam vasitəsi ilə uzaq qohumlar yaxın, yaxınlar isə uzaq olar. Biz haqq və siz nahaq olduğunuz üçün sizinlə ”...döyüşəcəyik

Sonra Əbu-Nuh Zilkəlanın istəyi ilə şam qoşununun qarşısına çıxıb, Əmr Ası da Əmmar mövqeyindən, onun həzrət Əli (ə) ilə olmasından xəbərdar etmək istədi. O, düşməni bu məsələdən xəbərdar etməklə onların vicdanını oyatmaq və qan tökülməsinin qarşısını .almaq məqsədində idi

Bu iki şəxslə Əmr As arasında söhbət uzun çəkdi. Hətta Əmr As e`tiraf etdi ki, həzrət Peyğəmbər (s) Əmmarın haqdan dönənlər tərəfindən öldürüləcəyini, heç vaxt haqdan .uzaq düşməyəcəyini və atəşin onun bədənini yandırmayacağını buyurmuşdur

Əmr As Əmmarın Əli (ə) qoşununda olduğunu eşidib, onunla görüşmək istədi. Əmmar Həzrət Əlinin (ə) qoşunundan on iki nəfərlə və Əmr As Müaviyə qoşunundan on iki nəfərlə

birlikdə bir məhəldə görüş keçirdilər. Əvvəlcə, Əmr As Əmmarı moizə edərək onu döyüşdən çəkindirməyə çalışdı. Bir Allahdan, müştərək qiblədən, Qur`andan və Peyğəmbərin buyuruqlarından danışdı. Əmmar dedi: "Həmd olsun Allaha ki, səni bu e`tiraflara sövq etdi. Bizim siz bey`ət sındıranlarla savaşımız Peyğəmbərin (s) göstərişi ilədir. O buyurmuşdur: "Zalımlarla və haqdan üz döndərənlərlə savaşın..."

Uzun söhbətlərdən sonra Əmr As Əmmarın sözlərinin onun ətrafındakılara tə`sir edəcəyindən qorxaraq, ayağa qalxdı və öz qoşununa doğru hərəkət etdi. Amma həqiqət axtarışında olan Zulkəla hələ də götür-qoy edirdi.

Əmmarın bu savaşda şəhadətə çatması Həzrət Əlinin (ə) haqq olduğunu və Müaviyənin zalımlığını sübut edən mö`təbər bir sənəd idi. Əmmardan qabaq qətlə yetirilən Zulkəlanın ölümü Əmr Ası narahat etdi və o, Müaviyəyə dedi:

Bilmirəm Zulkəlanın ölümünə çox sevinək, yoxsa Əmmar Yasirin? Əgər Zulkəla“ Əmmardan sonra sağ qalsaydı, bütün qoşunumuzu Əliyə (ə) yönəldərdi və (qoşunumuz dağılıb gedərdi.”(١

Danışıqlardan heç bir nəticə çıxmadı və nəhayət, qanlı Siffeyn döyüşü başladı. Nur və zülmət, haqq və batil qoşunları üzbəüz gəldi. Döyüşün üçüncü günü Əmmar Yasir öz dəstəsi ilə düşmənlə qarşılaşdı. Qarşı tərəfdə Əmr As və onun dəstəsi dayanırdı. İman, təqva, fəzilət təcəssümü olan Əmmar bütün ömrü boyu haqq məktəbinin müdafiəçisi və təbliğçisi olmuşdu. O, döyüş səhnəsində də belə idi. Bu döyüşdə müsəlmanlara xitabən dedi: “Ey müsəlmanlar! Allahın və Onun rəsulunun düşmənini görmək istəyirsinizmi? Müsəlmanlara zülm, müşriklərə yardım edənlərə baxmaq istəyirsinizmi? İslamın qüdrətinə qorxu və ikrahla baxan, çarəsizlikdən təslim olan,



---

Əl-Kamil”, c. ۲, s. ۳۸۱“ [۲۷] -۱

Peyğəmbərin vəfatından sonra düşmən kimi tanıdığımız, günahkarların dostu kimi bildiyimiz şəxsi görmək istəyirsinizmi? Agah olun! Bu şəxs Müaviyədir. Ona lə`nət oxuyun, ona Allahın lə`nəti olsun. O daim Allah nurunu söndürməyə çalışmış, Allah ".düşmənləri ilə həmahəng olmuşdur

Bu vaxt Əmr Asın bayrağına gözü dəyən Əmmar dedi: "And olsun Allaha! Biz bu bayraqla üç dəfə vuruşmuşuq. Onlar bu döyüşdə də hidayət olası deyillər və əvvəlki (küfrlərində batıb qalarlar..."(١

**Əmmar və digərlərinin hücuma keçməsi**

Əmmar şəhadəttələb bir dəstə ilə, Allah yolunda qırmızı ölümün öncülləri ilə Ziyad ibn Nəzirin bayrağı altında hücuma keçdi. Onlar qəhrəmancasına vuruşaraq, Əmr As və .onun qüvvələrini geriyə oturtdular

Bə`ziləri həzrət Peyğəmbərin (s) müsəlmanlarla döyüşü qadağan edən buyuruğunu yada salaraq, canlarını qurtarmağa çalışırdılar. Əmmar



---

Əl-ixtisas, s. ۱۴ [۲۸] -۱

onlara müraciətlə dedi: “Bəli... Amma bunlar İslama təslim olmamışlar. Onların təslimçiliyi zahirdədir və öz küfrlərini gizlətmişlər. Bununla özləri və küfr üçün dostlar tapmaq istəyirlər. And olsun Allaha, əgər bizim qoşunumuzu məğlub etsələr, yenə ”.onlar haqsızdırlar və biz haqlıyıq

Bu sözlər Əmmar Yasirin əqidəsinin dərinliyini göstərir. Mə`lum olur ki, mübarizə zamanı Əmmar zahirə aldanmır, düşmənin riyakarlıqlarına məftun olmur. Əmmarın bu sayaq agahlığı bütün haqq tərəfdarları üçün nümunə olmalıdır. Əmmardan ibrət .götürərək, həqiqət libası geymiş batili tanımalı və onunla vuruşa qalxmalıyıq

Döyüşdən bir müddət keçsə də, hələ ümumi həmlə başlamamışdı. İmam (ə) hücumdan qabaq öz fədakar döyüşçülərini hərb qaydaları, zəiflər və yaralılarla rəftar hədləri ilə tanış edirdi. O öz komandanlarına hərbi tə`limatlar verir, döyüş qaydalarını aydınlaşdırırdı. Həzrət

.ə) döyüşçülərə Allahın zikrini xatırladaraq, Allah-təaladan qələbə və mükafat diləyirdi)

Savaş başladı. Uzun müddət fədakarlıq üçün meydan axtaran haqsevərlər çox münasib fürsət əldə etmişdilər. Əmmar Yasirin başçılığı və Haşim Mirqalin bayrağı altında olan bir qrup mücahid öz döyüş hazırlıqlarını bildirdilər. Hücumdan qabaq Əmmar Yasir həzrət Əliyə (ə) yaxınlaşıb, ərz etdi: "Ey Allah rəsulunun (s) qardaşı! Meydana çıxıb, döyüşməyimə icazə verirsənmi?" həzrət (ə) buyurdu: "Səbr et! Allah ".sənə rəhmət etsin

Bir saat ötür. Əmmar yenidən imama (ə) yaxınlaşıb meydan icazəsi istəyir. İmam (ə) .isə əvvəlki cavabını təkrarlayır

Əmmar üçüncü dəfə imama (ə) müraciət etdikdə imamın (ə) gözləri yaşla dolur. Bu göz yaşları Əmmarın şəhadətindən danışır. Əmmar bunu hiss edib deyir: "Ya Əmirəl-mö`minin! Bu gün Peyğəmbərin (s) mənə xəbər verdiyi

gündür" İmam (ə) miniyindən düşüb, Əmmarı ağuşuna alır və onunla vidalaşıb buyurur: "Ey Əbul Yəzqan! Allah-təala özü və Peyğəmbəri (ə) tərəfindən sənə mükafat ".versin. Sən yaxşı qardaş və dost oldun

Əmmar deyir: "And olsun Allaha, açıq gözlə sənə ardıcıl oldum. Hüneyn döyüşü günü həzrət Peyğəmbər (s) mənə buyurdu: "Ey Əmmar! Məndən sonra fitnə qopar. Həmin vaxt Əlinin (ə) ardınca get. Çünki o haqladır, haqq isə onunla. Allah sənə İslamdan ən ".üstün mükafat əta etsin. Vəzifəni tam yerinə yetirdin və xeyirxahlıq etdin

Bu vaxt Əmmar su istəyir. Amma içməyə su olmur. Ənsardan bir kişi ayağa qalxıb ona bir kasa süd gətirir. Əmmar südü içir və bir anlıq fikrə gedir. Birdən üzündə təbəssüm ".peyda olur və deyir: "Peyğəmbər (s) mənə xəbər vermişdi ki, axırda içdiyin süd olacaq

:Əmmar meydana yola düşür. Şəhadət ümidi onu sevindirir. Belə bir rəcəz oxuyur

Şükür, çatdı gün ki, görüşəcəyəm

!Məhəmmədlə (s), onun dostlarıyla mən

Haqla batilin, döyüşü başlayır. Əmmar Yasir qoşununun arasından fəryad çəkərək deyir: “Ey insanlar! O kimdir ki, təşnə suya tələsdiyi kimi behiştə doğru tələssin? Behişt nizələrin kölgəsindədir, ey xalq! Qarşınızdakılar dinə həvəssiz gəldilər, qılınc qorxusundan müsəlman olduqlarını bildirdilər. Bu gün isə dindən çıxmaq üçün fürsət (tapıblar...”(١)

İslamın şücaətli döyüşçüləri Əmmarın sözlərini eşidib yerlərindən qalxdılar və düşmən qoşununa hücum çəkdilər. Əmmar daim Haşimi döyüşə təşviq edirdi. Haşim nizə ilə döyüşürdü. O misilsiz bir şücaətlə arxadakılar üçün yol açır və nizəsi sınan kimi Əmmar ona yeni bir nizə verirdi. Mücahidlərin hücumu Əmr Ası elə qorxuya saldı ki, dedi: “Əgər



---

Əl-ixtisas, s. ۱۳ [۲۹] -۱

”...əldə qara bayraq, hücuma belə davam olunsa, bütün Ərəb məhv edilər

**Əmmar Yasir qoşun başçısı idi**

O, bayraqdar Haşim Mirqal ilə Həzrət Əlinin dostlarından və İslam qoşununun qəhrəmanlarından idi. Əmmarın yaşı doxsanı adlasa da, onun qəlbi cavan, ümidli və .alovlu idi. Əmmarın ixlası, şəhadət şövqü, haqqa itaəti misilsiz idi

O, Müaviyə qoşunu ilə döyüşə getmək istəyərkən başını qaldırıb dedi: “Pərvərdigara! Əgər bilsəm ki, Sənin razılığın özümü Fərata atmaqdadır, bunu edərəm. Əgər bilsəm ki, Sənin razılığın qılıncı sinəmə sancıb, kürəyimdən çıxarmağımdadır, yerinə (yetirərəm.”(١

Bu döyüşdə Haşim Mirqal o qədər vuruşdu ki, nəhayət, taqətdən düşdü, qarnı yırtıldı, .yaralar vücudunu bürüdü. Amma bayraq hələ də əlində idi



---

Ə`yanüş-şiə”, c. ۸, s. ۳۷۴“ [۳۰] -۱

Bayrağın bir yerdə dayandığını görən Əmirəl-mö`minin (ə) Haşimin yanına adam göndərdi ki, bayraq qabağa aparılsın. İmamın (ə) göndərdiyi şəxs Haşimi çox ağır vəziyyətdə gördü. Haşim dedi: “Mənim salamımı Əmirəl-mö`mininə çatdır. De ki, Allahın rəhməti və bərəkəti olsun ona!...” nəhayət, Haşim Mirqal gözlərini dünyaya .əbədi qapadı

Həzrət Əli öz qoşununu həmin qanlı mövqedən aralı bir meydana çəkdi. Haşimin şəhadətindən sonra da Əmmar Yasir vuruşur, Şam qoşununa müraciətlə fəryad (çəkirdi: “Behişt qılıncların kölgəsində və ölüm nizələrin girovundadır.”(١

:Döyüş boyu insanları şücaətləndirən, düşmən qəlbinə xof salan rəcəzlər oxunurdu

Necə ki döyüşürdük

,Qur`an nazil olanda

Bu gün də deyilsiniz



---

Ə`yanüş-şiə”, c. ٨, s. ٣٧۴“ [٣١] -١

.Zərbəmizdən amanda

Necə də uzaq düşüb

,Başlar bədənlərindən

Pərdələnmiş həqiqət

.Bu gün güləsi hökmən

Haşim Mirqalın şəhadəti İslam döyüşçülərini mə`yus etsə də ali məqsədlərə doğru səfər qurbansız ötüşmür. Haqqın qələbəsi üçün Haşim və Əmmar kimi şəhidlərin qanına ehtiyac duyulur. Onlar öz canlarını böyük bir fəxrlə İslama hədiyyə etdilər. !Amma mükafatları daha böyük oldu: əbədi həyat

**Əmmarın şəhadəti**

Görüş məqamının əzəməti vəsvə gəlmir! Əmmar hələ də düşmənlə vuruşurdu. Qəlbini sarımış eşq, şəhadət sevgisi, Allahla görüşə məhəbbət onu canından keçmiş fədakar :bir qəhrəmana döndərmişdi. O döyüşə-döyüşə Allahı ilə danışır, şer`lər oxuyurdu

!Allah doğruçudur, əzəmətlidir

?Ya Rəbb, bu intizar çoxmu çəkəcək

,Şəhadətdən keçir Sənə gedən yol

.Bu qanlı meydanda doğranam gərək

Nəhayət, ۹۴ yaşlı bu qorxusuz aslan bir çox düşmən döyüşçülərini qanına qəltan etdikdən sonra nizə zərbəsindən yerə yıxıldı. Amansız düşmən onun başını bədənindən ayırdı. Amma bu sonluq Əmmar üçün səadət idi. Bir ömür mə`bud hüzurunda torpağa səcdə etmiş baş, nəhayət, şəhadət meydanında həqiqət yoluna təqdim olunurdu. Əmmarın şəhadət dağı Həzrət Əli (ə) üçün çox ağır idi. Əmmarın şəhadət xəbəri həzrətə (ə) çox tə`sir etdi, o bu aşiq insan üçün Allahdan rəhmət (dilədi.(۱

Gecə düşür, savaş alovu sönməyə başlayır. Əmirəlmö`minin (ə) gecənin qaranlığında şəhidlər arasında gəzir və nəhayət, Əmmarın pak cəsədinə çatır. O yerə oturur bu azadə şəhidin başını qucağına alır. Həzrət (ə) Əmmarın

səh:۵۰

---

Ə`yanüş-şiə”, c. ۸, s. ۳۷۵“ [۳۲]-۱

:şəhadətinə ağlayır və onun xatirəsini yad edərək belə deyir

,Ölüm, əl çəkəsi deyilsən məndən

.Bütün dostlarımı varmişəm əldən

,Yaxşı tanıyırsan dostları bir-bir

.Qapı-qapı gəlib alırsan əsir

Əmmar vəsiyyət etmişdi ki, onu öz libası ilə dəfn etsinlər. O, Allahın düşmənlərlə hesab çəkməsini istəyirdi. İmam (ə) onun cənazəsi üçün namaz qıldı və Əmmar öz qanlı (libaslarında torpağa tapşırıldı.(١

Böyük Peyğəmbər (s) səhabəsi, imamın fədakar köməkçisi, həqiqətin və Qur`anın güclü müdafiəçisi Əmmarın şəhadəti imamın (ə) və onun ətrafındakıların ruhunda dərin iz buraxsa da, Şam qoşununun da ruhiyyəsini sarsıtmışdı. Həzrət Peyğəmbərin (s) Əmmarın şəhadəti haqqında buyurduğu hədis çoxlarını Müaviyədən uzaqlaşdırdı və onun səh:٥١

---

Əsədul-ğabə, c. ۴, s. ۴٧ [٣٣] -١

müharibəsinin nahaq olduğunu sübuta yetirdi. Şam qoşununun tanınmış simalarından olan Əbdüllah Əmmarın şəhadətindən xəbər verən hədisə əsaslanaraq Müaviyəni tərk edib Həzrət Əliyə (ə) qoşuldu. Əbdüllahın bu hərəkəti Müaviyə cəbhəsini təlatümə gətirdi. Müaviyə Əmr Asın hiyləsi ilə belə bir şayiə yaydı ki, Əmmarın qatili onlar yox, Əmmarı müharibəyə çəkən şəxsdir. Bu şayiədən xəbər tutan Əmirəlmö`minin (ə) onların hiyləsini puça çıxararaq buyurdu: "Bu hesabla, həzrət Peyğəmbər (s) Həmzənin qatili hesab olunmalıdır. Çünki Həmzəni meydana o gətirmişdir!"(١)

Bir sözlə, Əmmarın vücudu əvvəlcə qeyd olunduğu kimi, həqiqət meyarı, imam (ə) qoşununun haqlı olmasının sübutu idi. Əmmarın şəhadətindən sonra onun döyüş yoldaşları dünyanı özləri üçün dar gördülər və düşmən qoşununa hücum edib, ona sarsıdıcı zərbələr



---

١- [٣۴] "Ə`yanüş-şiə", c. ٨, s. ٣٧٥

endirdilər. Müaviyə fədakar şirlərin nərəsini xeyməsinin yaxınlığında eşidib canını qurtarmaq üçün yeni bir hiylэyə əl atdı. Onun göstərişi ilə Qur`an nizələrin başına keçirildi. Həzrət Əlinin (ə) qoşunundakı bə`zi sadəlövh insanlar bu hiyləyə aldanaraq, hücumdan əl çəkdilər. Həzrət Əlini (ə) vadar etdilər ki, müharibənin taleyi mühakimə .yolu ilə həll edilsin

Əmmar Yasir Həzrət Əlinin (ə) güclü qolu idi. Malik Əştərin şəhadətindən sonra Müaviyə belə deyir: "Əli ibn Əbutalibin iki əli vardı. Onlardan biri Siffeyn döyüşündə kəsildi və o, Əmmar Yasir idi. O biri əli isə bu gün kəsildi və o Malik Əştərdir."(۱) .Müaviyə bu sözləri Malik Əştərin şəhadət xəbərini eşitdiyi vaxt demişdi



---

Əl-ixlas, s. ۸۱ [۳۵] -۱

Oxuduqlarınız İslam məktəbinin tərbiyəsini görmüş, vəhy çeşməsindən sirab olmuş, Məhəmmədi və Ələvi ruhundan qidalanmış bir insanın həyatından parçalar idi. Bu insanın həyatı onun əqidəsinin tərcüməçisi idi. Onun dərin imanı, ilahi e`tiqadı ömrünün ayrı-ayrı səhifələrində anbaan əks olunmuşdur. Adı və xatirəsi tarix səhifələrini zinətləndirən, haqtələblərə ilham verən insanlar məhz bu zümrədən .olanlardır

Əmmarın iman və səbri, bəsirət və şücaəti, fədakarlıq və haqqı müdafiəsi “necə .olmaq” sualına cavab axtaranlar üçün ilahi bir göstərişdir

!Salam olsun Əmmara! Salam olsun doğulduğu və haqq me`racına tələsdiyi günə

səh:۵۴

**Mündəricat**

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər sürəsi, ayə ۹

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ۲۰۰۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.۱

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.۲ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .۳ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.۱

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲
.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳
.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴
.Nəşriyyatın mənbələrini qeyd etmək.۵
.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir
:Müəssisənin fəaliyyəti
.Kitabların çapı və nəşri.۱
.Kitab oxumaq müsabiqələrinin təşkili.۲
.Məcazi sərgilərin istehsalı.۳
.Kompüter oyunlarının istehsalı.۴
Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵
.Sərgi məhsullarının və moizələrin istehsalı.۶
.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷
.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸
.Təlim kurslarının həyata keçirilməsi.۹
Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰
Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı
JAVA.۱
ANDROID.۲
EPUB.۳
CHM.۴
PDF.۵
HTML.۶
CHM.۷
GHB.۸
.v.Qaimiyyə kitab bazarı adına dörd market
ANDROID.۱
IOS.۲
WINDOWS PHONE.۳
WINDOWS.۴
deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik

:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹